*Azərbaycan Aqrar Elmi* **3 2018** *Аграрная Наука Азербайджана*

**UOT: 658; 005; 338.43**

# KƏND TƏSƏRRÜFATININ İDARƏ OLUNMASI MODELLERİ

**S.V.SALAHOV**

*Məqalədə aqrar sahənin idarə olunmasında hazırki vəziyyət iqtisadi və dövlət səviyyəsində idarəetmə və tənzimləmə modelleri üzrə aparıcı aqro-sənayə ölkələri hökümətlərinin qarşılıqlı təcrübəsi nəzərə alınmışdır. Müqayisəli təhlil göstərir, müxtəlif ölkələrdə dövlət və yerli idarəetmə orqanlarının qarşılıqlı əlaqəsinin həm oxşarlıqları, həm də fundamental fərqlilikləri var. Məqalədə dövlət və yerli hökümət səviyyəsində kənd təsərrüfatının idarəedilməsi metodları, təşkilatı strukturu və funksiyaları verilmişdir.*

***Açar sözlər:*** *Aqrar-sənayə kompleksi, kənd təsərrüfatı, yerli hökümət orqanları, aqrar istehsalçılar.*

Azərbaycan Respublikası dövlət müstəqilliyini bərpa etdikdən sonra ölkə iqtisadiyyatı sosialist təsərrüfatçılıq sisteminin tamamilə tənəzzülə uğradığı bir gərçəkliklə qarşılaşmışdı. Artıq bu sistemin davam etdirilməsinin mənasızlığını görən ümumilli lider Heydər Əliyev bazar iqtisadiyyatına keçilməsini bir mənalı surətdə ortaya qoydu. İlkin olaraq aqrar sahədə həyata keçirilən aqrar islahat nəticəsində kənd təsərrüfatında mülkiyyət forması dəyişdirildi, torpaq islahatı həyata keçirildi.

Nəticədə əvvəlki, sistemdən fərqli kiçik və orta ölçülü özəl sahibkarlar yaradıldı. İlk illərdə ölkədə ərzaq qıtlığının aradan qaldırılmasında kənd əhalisinin gəlirlərinin artırılmasında mühüm rol oynayan bu təsərüfatlar zaman keçdikcə ciddi problemlərlə qarşılaşdılar. Bu çoxsaylı problemlərdən biri və bəlkədə ən əsası idarəetmə məsələlərinin həlli ilə bağlı idi.

Kənd təsərrüfatının idarə edilməsi və tənzimlənməsi sahəsində xarici ölkələrin təcrübəsinin Azərbaycan Respublikasında mövcud şəraitə uyğunlaşdırıla bilən və xüsusilə yerli özünüidarə səviyyəsində aqrar siyasəti təkmilləşdirməyə və aqrar-sənaye istehsalının inkişafına imkan yaradan innovasiya istiqamətlərini üzə çıxarmaq üçün bu təcrübənin öyrənilməsi zəruridir.

Xarici ölkələrdə kənd təsərrüfatı məhsulları istehsalının dövlət səviyyəsində idarə edilməsinin və tənzimlənməsinin məqsədləri: ölkədə istehsal edilən kənd təsərrüfatı məhsullarının əsas növləri üzrə tam ərzaq müstəqilliyi məsələsinin həlli; əhalinin münasib (aşağı) qiymətli ərzaq məhsulları ilə təmin edilməsi; fermerlərin həyat səviyyəsinin yaxşılaşdırılması, o cümlədən gəlirliliyin artırılması və ixracın dəstəklənməsi hesabına; kənd təsərrüfatı məhsulları istehsalının ətraf mühitə mənfi təsirinin aradan qaldırılması.

Xarici ölkələrdə kənd təsərrüfatının idarə edilməsində kənd təsərrüfatı məhsulları istehsalçılarının gəlirinin və mənfəətinin formalaşmasına xüsusi əhəmiyyət verilir.

Xarici ölkələrdə kənd təsərrüfatının idarə edilməsi sistemi dövlət səviyyəsində idarəçilikdən (dövlət tənzimləməsindən) və təsərrüfat səviyyəsində idarəçilikdən ibarətdir. Bu halda dövlət tənzimləməsi kənd təsərrüfatını dövlət və bələdiyyə idarəetmə orqanlarının prioritetli idarəçilik funksiyalarından biridir. İnkişaf etmiş xarici ölkələrdə təsərrüfat səviyyəsində idarəçilik sistemi kənd təsərrüfatının tərkibinə daxil olan təsərrüfat subyektlərinin kooperasiya və inteqrasiyası əsasında qurulmuşdur. Fermer kooperativlərinin, müvafiq ittifaqların və assosiasiyaların sərəncamında anbar yerləri, avadanlıq və kompüter texnikası olur. Bu qurumlar kənd təsərrüfatı məhsullarının yetişdirilməsi, emalı, satışı və başqa fəaliyyət növləri ilə məşğul olurlar.

Təsərrüfatlar, emal müəssisələri və ticarət müəssisələri arasında kontraktasiyaya əsaslanan inteqrasiya əlaqələrinin güclənməsi xarici ölkələrdəki müəssisə və təşkilatların səciyyəvi cəhətidir. Məsələn, ABŞ-da qarışıq yem istehsal edən iri şirkətlərin mülkiyyətində quşçuluq və donuzkökəltmə müəssisələri vardır. Qarışıq yem istehsalı üzrə ixtisaslaşan kooperativlər Qərbi Avropada da geniş yayılmışdır. Kənd təsərrüfatı əmtəə istehsalçıları tərəfindən yaradılan belə müəssisələrin çoxunun öz ticarət şəbəkələri var.

Aqrar cəhətdən inkişaf etmiş ölkələrdə dövlət orqanları ilə yerli özünüidarə orqanlarının qarşılıqlı fəaliyyətini və bu halda istifadə edilən iqtisadi, təşkilati və başqa mexanizmləri araşdırarakən qeyd etmək lazımdır ki, yerli hakimiyyət orqanlarına özünüidarə hüququ verilmiş olsa da, onların qüvvədə olan milli qanunvericilik çərçivəsindən kənara

çıxmaması üçün dövlət hakimiyyəti orqanları yerli hakimiyyət orqanlarının fəaliyyətinə nəzarət etməyə çalışırlar. (1)

Xarici ölkələrdə aqrar-sənaye kompleksi sahəsində dövlətin yerli idarəetmə orqanlarına əsas təsir mexanizmləri aşağıda qeyd edilənlərdir:

- öz rayonlarında kənd təsərrüfatı məhsulları istehsalının təşkili vaxtı yerli orqanların maliyyə asılılığı faktından, həmçinin, xüsusilə ixrac vaxtı, istehsal edilmiş məhsulun reallaşdırılmasına kömək edən təşkilati tədbirlərdən istifadə edilməsi;
- istehsalın kvotalaşdırılması, fermerlərin iştirak etdiyi müxtəlif məqsədli proqramların (kənd təsərrüfatı təyinatlı torpaqların konservasiyası, dövri xarakter daşımayan ödənişlər, kənd təsərrüfatı bitkilərinin məhsullarının müxtəlif risklərdən sığortalanması və s.) işlənib hazırlanması və maliyyələşdirilməsi yolu ilə yerli hakimiyyət orqanlarının və bilavasitə fermer təsərrüfatlarının fəaliyyətinin tənzimlənməsi;
- yerli hakimiyyət orqanlarının işinə nəzarət edilməsi məqsədilə onların fəaliyyətinə kuratorluq funksiyalarının müəyyən edilməsi;
- yerli hakimiyyət orqanlarının federal hakimiyyət orqanları qarşısında, xüsusən ayrılmış maliyyə vasitələrinin məqsədli istifadəsi hissəsində hesabatının bəzi növlərinin müəyyən edilməsi.

İnkişaf etmiş xarici ölkələrdə aqrar-sənaye kompleksi sahəsində federal və yerli idarəetmə orqanlarının qarşılıqlı təsirinin kifayət qədər **effektiv modellərindən istifadə edilir**. Uzun illər ərzində yaranmış bu modellərin kənd təsərrüfatı məhsulları, xammal və ərzaq istehsalı və satışında tətbiqi müsbət nəticələr verir. Avropa İttifaqının üzvü olan bir sıra ölkələrdə (Fransa, Almaniya, İtaliya və başqaları) yerli orqanların dövlət orqanlarına tabeliyi sistemi əsasında qurulmuş modellərdə bu orqanların qarşılıqlı təsiri vertikalı izlənir. Bəzi ölkələrdə, məsələn, ABŞ-da, Böyük Britaniyada tətbiq edilən modellərdə isə hüquqi baxımdan tabelik münasibətləri yoxdur, amma praktikada həm kənd təsərrüfatı məhsullarının istehsalı vaxtı, həm də milli və dünya ərzaq bazarlarında bu məhsulların satışı zamanı qarşılıqlı əlaqə və böyük asılılıq, əsasən, maliyyə asılılığı mövcuddur.

Aparılmış müqayisəli təhlil göstərir ki, müxtəlif ölkələrdə federal və yerli idarəetmə orqanlarının qarşılıqlı əlaqəsi modellərində müəyyən oxşarlıqlarla bərabər prinsipial fərqlər də var. Məsələn, amerika və alman modelləri arasında əsas oxşarlıq təsir vasitələrinin və formalarının oxşar olmasıdır, amma hər bir yerli orqan bu təsir vasitələrinin yerli fermerlər üçün daha münasib olan formasını seçir. Lakin xarici ölkələrin əksəriyyətində dövlət hakimiyyəti orqanları ilə yerli idarəetmə orqanları arasında qarşılıqlı təsir modelləri mükəmməllikdən uzaqdır, çünki həmin ölkələrdə tarixi ənənələr, yerli əhalinin kənd təsərrüfatı məhsullarına ehtiyacı, kənd ərazilərinin inkişaf səviyyəsi, təbii landşaftların qorunub saxlanması və ən başlıcası - kənd əhalisinin yaşayış səviyyəsinin və kənd təsərrüfatı əmtəə istehsalçılarının gəlirlərinin artırılması zərurəti nəzərə alınmalıdır.

**Amerika Birləşmiş Ştatları kənd** təsərrüfatı məhsullarının bir sıra növlərinin istehsalı və dünya ərzaq bazarına çatdırılması üzrə dünyada aparıcı yerləri tutan ən böyük aqrar dövlətdir. Bu ölkədə kənd təsərrüfatı xammalının bəzi növləri daxili tələbatdan artıq istehsal edilir. Kiçik ailə fermalarından başlamış, böyük torpaq sahələrinə malik olan iri beynəlxalq şirkətlərə qədər müxtəlif fermer təsərrüfatlarında kənd təsərrüfatı məhsulları istehsalı ilə məşğul olan 3 milyon işçi çalışır (1).

Bu ölkədə hər 6 ildə bir dəfə qəbul edilən xüsusi qanunla milli iqtisadiyyatın aqrar sektorunun inkişafının hədəf göstəriciləri, bu göstəricilərə nail olmaq mexanizmləri, həmçinin kənd təsərrüfatında bazar münasibətlərinin inkişafı və dövlət tənzimləməsi arasında əsas nisbətlər müəyyən edilir. ABŞ-da fermerlərin 91%-inin istifadəsində olan kənd təsərrüfatı təyinatlı torpaqlar tamamilə və ya qismən onlara məxsusdur və fermerlərin yalnız 9%-i belə torpaqları icarəyə götürürlər.

**ABŞ Kənd Təsərrüfatı Nazirliyinin** tərkibində fermer təsərrüfatlarına risklərin idarə edilməsi digər mühüm istiqamətlər üzrə 10 müxtəlif xidmət qurumların iki agentlik, məhsulun sığortası üzrə korporasiya; heyvanların və bitkilərin sağlamlığı məsələləri üzrə müfəttişlik və sair bölmələr fəaliyyət göstərir. Nazirliyin tərkibində olan xidmətlər sırasında:

- daxili və xarici kənd təsərrüfatı bazarları üzrə xidmətlər;
- tədqiqatlar, təhsil və ekstensiv kənd təsərrüfatı sahəsində qarşılıqlı əlaqələr üzrə dövlət xidməti;
- təbii resursların mühafizəsi xidməti və iqtisadi araşdırmalar xidməti xüsusi qeyd edilməlidir. Hər bir ştatda kənd təsərrüfatı departamentləri var. Həmin departamentlərin ən mühüm funksiyaları kənd təsərrüfatı məhsulları bazarının iştirakçılarının maliyyə durumunun monitorinqini keçirməkdən və müvafiq standartlar müəyyən etməkdən ibarətdir. (1)

Aqrar sahəyə aid bir sıra dövlət proqramlarının reallaşdırılması ilə bağlı işlərin xeyli hissəsi yerli səviyyədə və ştatlar səviyyəsində həll edilir. Bundan başqa, bu hakimiyyət orqanları kənd təsərrüfatının dövlət tənzimlənməsində iştirak edir, ona elmi-informasiya xidmətinə, təbiətdən istifadənin tənzimlənməsinə və kənd regionlarının inkişafına əhəmiyyətli dərəcədə təsir göstərirlər. Vergitutma, aqrar məhsulların marketinq sistemləri, ərzağın keyfiyyətinə nəzarət və ərzaq təhlükəsizliyi, imkansız vətəndaşlara ərzaq yardımı kimi məsələlərin

tənzimlənməsində yerli hakimiyyət orqanları ciddi məsuliyyət daşımırlar.

Dövlət səviyyəsində hər il 10-dan çox sahələrarası **məqsədli proqramlar** həyata keçirilir. Amerika fermerlərinin 1/3 hissəsi "**Qiymətlərin dəstəklənməsi üzrə Dövlət Proqramı**"nda iştirak edir. Bu məqsədlə ayrılan maliyyə vəsaitinin 70%-i əmtəə məhsulunun həcmi ən azı 100 min dollar olan fermer təsərrüfatlarının payına düşür. "**Fermerlərin gəlirlərinin sabitləşməsi**" proqramı da əsas proqramlar sırasına aiddir. Hazırda bütün büdcə təxsisatlarının 50%-ə qədəri bu proqramın reallaşdırılmasına yönəldilir. **Bu proqramın tərkibinə iki altproqram daxildir: "Məhsulun sığortalanması" və "Kənd təsərrüfatı krediti".** Fermerlər məqsədli proqramlara ayrılan maliyyə vəsaitlərindən ştatlar və yerli səviyyəli idarəetmə orqanları tərəfindən aparılan bölgü yolu ilə istifadə edirlər. Hər il bütün fermer təsərrüfatlarının təxminən 90%-i dövlət proqramlarında iştirak edirlər. Nazirliy bir sıra məhsulların, xüsusən taxılın və pambığın qiymətlərinin fermerlər üçün minimal səviyyədə saxlanmasına **yönəlmiş proqramların reallaşdırılmasına xüsusi diqqət yetirir**. Qiymətlərin dəstəklənməsi proqramları üçün büdcədən ayrılan xərclər illər üzrə fərqlənir: məhsul bol, daxili bazarda qiymətlər aşağı olan illərdə büdcədən ayrılan xərclər artır. ABŞ Kənd Təsərrüfatı Nazirliyi həm fermer təsərrüfatlarına maliyyə yardımı göstərmək, həm də dünya ərzaq bazarında standart tələblər və qiymətlər haqqında fermer təsərrüfatlarına tam informasiya təqdim etməklə, istehsal edilmiş məhsulun rəqabətə davamlılıq göstəricisinin kifayət qədər yüksək olmasına zəmanət verir.

**Avropa İttifaqında** kənd təsərrüfatı məhsulları istehsalı üzrə aparıcı yerləri Fransa və Almaniya tutur. Bu ölkələrdə kənd təsərrüfatının idarə olunmasına fövqəlmilli və milli orqanlar cəlb edilmişdir. Kənd təsərrüfatının idarə olunmasına cəlb edilmiş fövqəlmilli orqanlar (Avropa Birliyinin rəhbər orqanları) əsasən Avropa İttifaqına daxil olan ölkələrin dövlət orqanları ilə qarşılıqlı əlaqə saxlayır, həmin ölkələrin daxilində isə idarəetmə və əlaqələndirmə funksiyaları milli federal hakimiyyət orqanlarına - Fransada Kənd Təsərrüfatı və Meşə Təsərrüfatı Nazirliyinə, Almaniyada isə Federal Ərzaq və Kənd Təsərrüfatı Nazirliyinə həvalə edilmişdir.

**Fransada** ərzaq kompleksinin idarə edilməsi funksiyaları Kənd Təsərrüfatı və Meşə Təsərrüfatı Nazirliyi, Nazirliyin regional idarələri və departamentləri, kənd təsərrüfatı palataları, həmçinin bir sıra qarışıq - yarımdövlət və peşəkar təşkilatlar tərəfindən həyata keçirilir. Nazirliyin əsas funksiyaları aiddir:

- ərzaq kompleksi və meşə təsərrüfatı sahəsində maliyyə, inzibati və texniki xarakterli tədbirlərin əlaqələndirilməsi;
- kənd təsərrüfatının modernləşdirilməsi probleminin və tarif siyasətinin öyrənilməsi;
- kənd təsərrüfatı məhsulları bazarına təsir və məhsul ixracının təşviq edilməsi;
- ərzaq məhsullarının keyfiyyətinə nəzarət, bitkilərin və heyvanların mühafizəsi;
- kənd təsərrüfatı məhsulları istehsalında beynəlxalq kooperasiya məsələləri.

Nazirliyin tərkibinə 9 bölmə daxildir. Bu bölmələr onların qarşısına qoyulmuş məsələlərin həlli üçün dar ixtisaslaşdırılmış struktur vahidləri şəklində komplektləşdirilmişdir. Kənd təsərrüfatının yerli səviyyədə idarə edilməsi funksiyaları 22 regional idarə və 100 departament tərəfindən həyata keçirilir. Regional və departament idarələri emal sənayesi ilə, fermerlər və başqa kateqoriyalara aid kənd əhalisi ilə bilavasitə əlaqədə olur. (1)

Bu ölkədə kənd təsərrüfatının idarəedilmə sisteminin səciyyəvi xüsusiyyəti ondan ibarətdir ki, bu sistemdə müxtəlif peşəkar kənd təsərrüfatı orqanları mühüm yer tutur. Kənd təsərrüfatı palataları sistemi və həmkarlar ittifaqları şəbəkəsi aqrar siyasətin formalaşmasına nəzərəçarpacaq dərəcədə təsir göstərirlər. Onlar müəyyən normativ səlahiyyətləri yerli kənd təsərrüfatı ənənələrinin qorunmasını və kənd təsərrüfatı məhsullarının satışı üzrə normalarını tətbiq edirlər. İnkişaf etmiş həmkarlar ittifaqları şəbəkəsi dövlətin aqrar siyasətinə ciddi təsir göstərir. Fransada kənd təsərrüfatı məhsulları istehsalı və məhsul satış bazarlarını idarəetmə orqanlarının vahid sistemi fəaliyyət göstərir. İxtisaslaşdırılmış orqanlar fermer təsərrüfatlarının fəaliyyətində məsləhət, informasiya və əlaqələndirmə funksiyalarını yerinə yetirirlər (2).

Avropada kənd təsərrüfatı məhsulları istehsalı üzrə Fransadan sonra ikinci yeri **Almaniya** tutur. Bu ölkənin hökuməti, siyasi və ictimai təşkilatları Avropa İttifaqının vahid aqrar siyasəti çərçivəsində kənd təsərrüfatının inkişafına imkan yaradırlar. Aqrar strukturun təkmilləşdirilməsi, fermer təsərrüfatlarına kreditlər verilməsi və onların maliyyələşdirilməsi ilə bağlı məsələlərin həllini dövlət orqanları öz üzərinə götürür. Almaniyada qəbul edilmiş **Kənd Təsərrüfatı haqqında Qanunda** Aqrosənaye Kompleksi sahəsində mərkəzi və yerli idarəetmə orqanlarının qarşılıqlı fəaliyyətinin prinsipləri təsbit olunmuşdur. Almaniyada kooperasiya prinsipləri əsasında yaradılmış çoxsaylı **cəmiyyətlər,** ictimai ittifaqlar və təşkilatlar əmtəə istehsalçılarının mənafelərini yerli, əyalət, federal və ümumavropa səviyyələrində təmsil edirlər. Kənd təsərrüfatı məhsullarının istehsalı və satışı sahəsində fəaliyyət göstərən müxtəlif növ kooperativ qurumlar iri özəl firmalarla sıx əməkdaşlıq edirlər. **Almaniya kooperativləri** kənd təsərrüfatında inteqrasiya

sxemlərinin yaradılması məsələlərində özəl firmalarla müqayisədə **bir sıra üstünlüklərə malikdirlər.**

Qərarlar qəbul edilməsi ilə bağlı əsas funksiyalar rayon və yerli idarəetmə orqanlarına, yəni yerlərdə konkret qərarların hazırlanması üçün lazım olan ilkin informasiyanın yarandığı strukturlara aiddir. Bu halda yerli orqanlar kənd təsərrüfatı məhsulları istehsalının təşkili və planlaşdırılması zamanı yerli təbii və iqtisadi xüsusiyyətləri maksimum dərəcədə nəzərə almaq imkanı əldə edirlər. Bununla birlikdə, Almaniyanın tərkibinə inzibati bölgü vahidləri kimi daxil olan 16 federativ əyalətdə federal nazirlik - əyalət nazirliyi xətti üzrə vertikal koordinasiya təcrübəsi formalaşmışdır.

Bu ölkədə yerli idarəetmə orqanları və fermer təsərrüfatları ilə birbaşa qarşılıqlı əlaqə federal əyalət nazirliklər tərəfindən həyata keçirilir. Bu nazirliklər yetərli sayda bölmələr və mütəxəssislərlə komplektləşdirilmişdir. **Məsələn, Bavariya federal əyalətinin Ərzaq, Kənd Təsərrüfat və Meşə Təsərrüfatı Nazirliyinin tərkibinə 3 baş idarə, kənd yerlərinin inkişafı üzrə 7 xidmət, Texnologiya və Dəstək Mərkəzi, Rəhbər Kadrların Dövlət Akademiyası yanında 47 ərzaq, kənd təsərrüfat və meşə təsərrüfatı xidməti, aqrar iqtisadiyyat üzrə 7 peşə məktəbi, 3 ali əkinçilik məktəbi və ixtisaslaşdırılmış bölmələri, o cümlədən ev təsərrüfatı bölməsi olan bir çox başqa kənd təsərrüfatı məktəbləri daxildir. Nazirlik onun tabeliyində olan idarə və təşkilatların işgüzar sahədə fəaliyyətinə, aqrar sahədə və ev təsərrüfatı sahəsində təhsil və məsləhət məsələlərinə nəzarət, Avropa İttifaqının ödəmə kassasından ayrılan vəsaitlərin bölgüsü funksiyalarını həyata keçirir** (1).

**İngiltərədə** geniş yayılmış fermer təsərrüfatlarının hər birində istifadə edilən kənd təsərrüfatı təyinatlı torpaqların sahəsi təxminən 70 hektar həddindədir. Bu ölkədə təxminən 405 fermer təsərrüfatının hər birinin malik olduğu torpaq sahəsi isə 100 hektardan çox deyil. Fermerlər əksər hallarda öz torpaq sahələrinin sahibləri olur və servis, marketinq və məsləhət xidmətlərinə ehtiyac duyurlar, belə xidmətlər idarəçi şirkətlər və banklar tərəfindən onların menecerləri vasitəsilə təqdim edilir.

**Böyük Britaniyanın kənd təsərrüfatı idarəsi aşağıda sadalanan istiqamətlər üçün cəmiyyət qarşısında məsuliyyət daşıyır**:

- əhalinin sağlamlığının qorunması və keyfiyyətsiz kənd təsərrüfatı məhsullarından mühafizə;
- dövlətin ərzaq təhlükəsizliyi; kənd təsərrüfatı məhsulları istehsalının ekoloji təhlükəsizliyi;
- torpaqdan istehsal vasitəsi kimi istifadə;
- sahənin iqtisadi göstəricilərinin və onların dəyişmə meyllərinin təhlili;
- kənd təsərrüfatı üzrə ümumavropa qanunvericiliyinin reallaşdırılması;
- Avropa İttifaqı ölkələri ilə əməkdaşlıq və britaniyalı fermerlərin mənafelərinin müdafiəsi;
- kənd təsərrüfatı heyvanlarının mühafizəsi;
- sahənin daxili resurslarından istifadə.

İdarə fermer təsərrüfatlarının işlərinə qarışmadan, bütün sadalanan istiqamətlər üzrə yalnız ümumdövlət əhəmiyyətli problemləri həll edir.

**Böyük Britaniyanın Kənd Təsərrüfatı** İdarəsinin idarəçi və əlaqələndirici rolu, həmçinin fermer təsərrüfatları ilə qarşılıqlı əlaqəsi aşağı səviyyədədir və ya praktik olaraq yoxdur. Fermerlərin müxtəlif təşkilatları əksər hallarda **kooperativ formasında yaradılır və öz problemlərini çox vaxt özləri həll edir. Burada fermer cəmi bir funt sterlinq həcmində səhmə malik olur və kooperativi direktorlar şurası idarə edir**. Hazırda kooperativlər ixtisaslaşma prinsipi üzrə təşkil olmaqla marketinq və təchizat kooperativlərindən ibarətdir. Lakin yeni iştirakçıların cəlb edilməsi üçün sərt rəqabət şəraitində kooperativlər adi ixtisaslaşma çərçivəsindən kənara çıxaraq öz fəaliyyət sahələrini genişləndirməyə məcbur olurlar. Bir qayda olaraq, iri emal şirkətlərinə və ya torpaq sahibkarlarına məxsus olan iri çoxsahəli fermalarda idarəetmənin ciddi ixtisaslaşması bu fermaların daxili təşkilinin və onların idarə edilməsinin fərqləndirici xüsusiyyətidir. Burada "taxılçılıq üzrə menecer", "tərəvəzçilik üzrə menecer" və s. anlayışlar adi hal almışdır. Sahəvi strukturları özündə birləşdirən ərazi qurumlarına baş direktor rəhbərlik edir. Böyük Britaniyada kənd təsərrüfatını idarə edən dövlət orqanları ilə yerli orqanlar arasında qarşılıqlı əlaqə zəifdir.

Son illərdə - bu ölkə Dünya Ticarət Təşkilatına daxil olandan və mərhələli şəkildə bazar islahatları həyata keçirildikdən sonra kənd təsərrüfatını idarə edən dövlət orqanları ilə yerli orqanlar və kəndlilər arasında qarşılıqlı əlaqənin müxtəlif formalarından istifadə yolu ilə kənd təsərrüfatında sabit iqtisadi və sosial artım müşahidə olunur. Çin, kənd təsərrüfatının iqtisadi potensialının ardıcıl atımını təmin etməklə, istehsalın həcmində və əhalinin həyat səviyyəsində kəskin geriləməyə yol vermədən, yeni iqtisadi sistemə nisbətən ağrısız keçidə müvəffəq olmuşdur. Bu irəliləyiş taxıl istehsalı sahəsində daha ciddi hiss olunur. Belə ki, taxıl istehsalının illik ümumi həcmi 621 milyon tona çatdırılmışdır. Çin Hökuməti hazırda kəndlilərə hərtərəfli dəstək siyasətini tətbiq edir, onlar kənd təsərrüfatı vergisindən tamamilə azad ediliblər. Subsidiyalar və dotasiyalar artırılıb, taxıl üçün minimal satınalma

qiymətləri, həcminə və satınalma qiymətlərinə zəmanət verilən dövlət sifarişləri tətbiq olunur.

Ölkədə kənd təsərrüfatının idarə edilməsinin ikiqat strukturu tətbiq olunur – sahəvi prinsip və siyasi prinsip. Bu halda, Kommunist Partiyasının qərarları federal və regional idarəetmə orqanları üçün məcburidir. Çində kənd təsərrüfatını idarəetmə sistemində aşağı səviyyəli idarəetmə orqanlarının (əyalətlər, kəndli kommunaları və başqaları) Kənd Təsərrüfatı Nazirliyinə tabeliyi vertikalı praktiki olaraq dəyişməz qalmışdır. **Nazirlik kənd təsərrüfatı məhsullarının istehsalı üzrə inkişaf planlarını və müvafiq tapşırıqları aşağı səviyyəli idarəetmə orqanlarına çatdırır, onların icrasını təşkil edir, işlərin gedişinə və onların tamamlanmasına nəzarət edir** (3).

**Belarus Respublikasında** aqrosənaye kompleksinin idarə edilməsi çoxsəviyyəli struktura malik olub, dövlət, vilayət və rayon səviyyələrini əhatə edir. Aqrosənaye kompleksi sahəsində dövlət siyasətinin idarə edilməsi Belarus Respublikası Kənd Təsərrüfatı və Ərzaq Nazirliyi tərəfindən həyata keçirilir. Bu Nazirliyin tərkibinə 17 struktur bölmə, 10 baş idarə, 2 bölmə, 1 departament və 4 idarə daxildir.

Kənd təsərrüfatının idarə edilməsi, əlaqələndirilməsi və tənzimlənməsi sahəsində Kənd Təsərrüfatı və Ərzaq Nazirliyinin əsas vəzifələri bunlardır:

- kənd təsərrüfatı sahəsində vahid dövlət siyasətinin həyata keçirilməsi;
- dövlət idarəçiliyi sahəsində başqa orqanların, həmçinin yerli icraedici və sərəncamverici orqanların səlahiyyətlərinə daxil olan məsələlər üzrə fəaliyyətinin əlaqələndirilməsi;
- kənd təsərrüfatı texnikasının texniki vəziyyətinə dövlət nəzarəti; qanunvericiliklə müəyyən edilmiş başqa nəzarət və əlaqələndirmə funksiyaları.

Belarusda Baş Dövlət Texniki Nəzarət İdarəsi, bitki mühafizəsi, baytarlıq və cinsyetişdirmə xidmətləri Kənd Təsərrüfatı və Ərzaq Nazirliyinə tabedirlər.Regional səviyyədə kənd təsərrüfatının idarə edilməsi və tənzimlənməsi fəaliyyəti vilayət kənd təsərrüfatı və ərzaq komitələri tərəfindən həyata keçirilir. Bu komitələr hüquqi şəxs statusuna malikdir və öz fəaliyyətində Kənd Təsərrüfatı və Ərzaq Nazirliyinə tabedirlər (4).

**Beləliklə, Belarus Respublikasında aqrosənaye kompleksinin idarə edilməsi sahəsində dəqiq idarəetmə vertikalı yaranmışdır.** Aşağı səviyyəli idarəetmə orqanları öz işlərinin nəticələrinə görə Kənd Təsərrüfatı və Ərzaq Nazirliyi qarşısında məsuliyyət daşıyırlar. Bunun sayəsində kənd təsərrüfatında xüsusilə südlük heyvandarlıq sahəsində yüksək nailiyyətlər qazanılmışdır. Belarus Respublikasında istehsal olunan süd və süd məhsulları dünyanın 24 ölkəsinə ixrac edilir.

Xarici ölkələrdə kənd təsərrüfatı sahəsində fəaliyyətin tənzimlənməsi və əlaqələndirilməsi təcrübəsindən irəli gələn nəticələri aşağıdakı kimi səciyyələndirmək olar:

1) Qabaqcıl xarici ölkələrlə müqayisədə Azərbaycanda yerli özünüidarəetmə orqanları arasında qarşılıqlı təsirinin zəifliyinin əsas səbəblərindən biri xarici ölkələrlə müqayisədə yerli özünüidarə orqanlarının aqrar istehsalın maliyyə və maddi-texniki təminatında qabaqcıl kifayət qədər iştirak edə bilməməsidir. Bu orqanların struktur tərkiblərinin bəsitliyindən irəli gəlir. Bu məsələnin həllində Fransa, ABŞ və Belarusun təcrübəsindən istifadə edilməsi maraq doğurur.

2) Yerli kənd təsərrüfatı xammalının və ərzağın keyfiyyətinə səmərəli nəzarətin Avropa İttifaqı ölkələrinin və ABŞ-ın təcrübəsi nəzərə alınmaqla təşkil edilməsi mümkündür.

3) Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin mərkəzi aparatında Alman təcrübəsinə əsasən yerli özünüidarə orqanları və kənd təsərrüfatı əmtəə istehsalçıları assosiasiyalarının (ittifaqlarının) fəaliyyətinin əlaqələndirilməsi üzrə bölmənin yaradılması məqsədə uyğundur.

4) Satış kooperativlərini dəstəkləmək və yerli kənd təsərrüfatı məhsullarının yüksək rəqabətədavamlılığını təmin etmək, o cümlədən dünya ərzaq bazarında, xüsusən rəqib ölkələrdə standart tələblər və qiymətlər haqqında etibarlı informasiyanın yerli özünüidarə orqanlarına çatdırılması; ABŞ Kənd Təsərrüfatı Nazirliyinin təcrübəsindən istifadə edilərək formalaşdırılması zəruridir.

5) Avropa İttifaqının üzvü olan bir sıra ölkələrdə (Fransa, Almaniya, İtaliya), həmçinin Çin, Belarus və başqa ölkələrin idarəetmə modellərində yerli orqanların mərkəzi orqanlar tabeçiliyi təcrübəsindən istifadə edilməsi maraq doğura bilər. Bu halda onların qarşılıqlı fəaliyyət vertikalı daha dəqiq izlənilə bilir.

Beləliklə, aqrar sahəsi inkişaf etmiş xarici ölkələrdə kənd təsərrüfatı məhsulları istehsalının idarə edilməsi sistemlərinin və modellərinin təhlili göstərir ki, kənd təsərrüfatı bu xarici ölkələrin əksəriyyətində idarəetmə sistem və modellərinə aşağıdakı institusional strukturlar daxil edilir:

- ixtisaslaşdırılmış dövlət orqanları, **kənd təsərrüfatı nazirliyi**;
- aşağı kənd təsərrüfatı strukturlarının və fermer təsərrüfatlarının fəaliyyətini tənzimləyən **ərazi idarələri, komitələr və komissiyalar;**
- **peşəkar kənd təsərrüfatı təşkilatları və kooperativ özünüidarə təşkilatları daxil edilmişdir.**

**Xarici ölkələrdə kənd təsərrüfatının idarə edilməsi təcrübəsindən bir sıra dəyərli istiqamətləri Azərbaycan Respublikasında tətbiq edilməsini tövsiyə etmək olar:**

- **yerli idarəetmə orqanlarının mərkəzi orqanlara tabeliyinə əsaslanan dəqiq qarşılıqlı əlaqə vertikalının formalaşdırılması;**
- **satış kooperativlərinə daha səmərəli dəstəyin verilməsi;**
- **Kənd Təsərrüfatı Nazirıliyinin mərkəzi aparatında yerli özünüidarə orqanlarının fəaliyyətinin əlaqələndirilməsi üzrə ayrıca bölmə yaradılması;**
- **yerli kənd təsərrüfatı xammalının və ərzağın keyfiyyətinə daha səmərəli nəzarətin formalaşdırılması;**
- **aqrosənaye kompleksi sahəsində yerli özünüidarəyə daha səmərəli dəstəyin verilməsi.**

Belə bir idarəetmə fəaliyyətinin formalaşdırılması respublika kənd təsərrüfatında iqtisadi artıma və səmərəliliyin yüksəldilməsinə əsaslı zəmin yarada bilər.

**ƏDƏBIYYAT**

1. А. Семкин. В.Быков «Зарубежный опыт развития органов местного самоуправления сельским хозяйством во взаимосвязи с госуправлением» Москва «АПК – экономика и управление, №2.2018 г. 2. Структура АПК зарубежных стран. [Электронный ресурс] – Режим доступа//http://geolike.ru/page/gl. 3. Главной задачей Китая в 2014 году станет развитие сельского хозяйства. [Электронный ресурс] - Режим доступа // http : // scecoop . ru / articles. 4. Государственное регулирование устойчивого развития сельского хозяйства: зарубежный опыт [Текст] / П.Д. Косинский, А.В. Харитонов // Проблемы современной экономики. – 2016. - №4. – С. 227-231.

**Моделирование в управлении сельским хозяйством**

**С.В.Салахов**

В статье рассматривается опыт управления аграрной сферой ведущих агропромышленных стран, по государственному и экономическому моделированию и управлению. Как показывает сравнительный анализ, отношения между государственными органами и органами местного самоуправления имеют сходство и фундаментальные различия в разных странах. Кроме того, на уровне местного самоуправления рассмотрены формы, методы и организационная структура управления сельским хозяйством.

***Ключевые слова:*** *агропромышленный комплекс, местные органы самоуправления, объединение производителей.*

**Modeling in management of agriculture**

**S.V.Salaxov**

In the article the current state of management of agrarian sector, the management and regulation models’ experience of interaction of the leading agro-industrial governments on economic and state-level governance and regulatory models are considered. Comparative analysis shows that the relationship between the state and local government bodies has similarities both in the different countries and in fundamental differences. At the local government level, agricultural management methods, organizational structure and their function are given. The article describes in detail.

***Key words:*** *agrarian-industrial complex, local government bodies, agrarian-producer associations*

**salahliaqronak@gmail.com**